# NİTQİN İFADƏLİLİYİ

Natiq fikrini düzgün, aydın, məqsədəuyğun ifadə etməklə yanaşı, onu cazibəli, təsirli, emosional bir formada verməyi, dinləyicinin qəlbinə, zehninə nüfuz edə biləcək inandırıcı dil vasitələrindən istifadə etməyi də bacarmalıdır. Parlaq, kəskin, orijinal, ifadəli nitq dinləyicilərin hisslərinə təsir edir, marağını artırır, diqqətini cəlb edir, fikrin məzmununu yaxşı dərk etməyə kömək göstərir. Bu nitq güclü məntiq, tutarlı söz, ifadə, cümlələrdən ibarətdir, həm də ifadəlidir, təsirlidir, emosionaldır.

Nitqdə **ifadəlilik,** emosionallıq müxtəlif vasitələrin köməyi ilə yaranır. Bura daxildir: **intonasiya(melodiya, temp, tembr, vurğu, pauza, ritm, səsin gücü, səsin diapazonu)**, leksik vahidlər: sinonim və antonimlər, frazeoloji birləşmələr, atalar sözü, zərbi-məsəllər, məcazi mənalı sözlər, birləşmələr, təkrarlar, ritorik fiqurlar, emosional nidalar və s.

**İntonasiya** latın sözüdür, "ucadan tələffüz etmək" mənasında işlənir. İntonasiya baxımından zəngin olan nitq maraqla dinlənilir. Dinləyicilər belə nitqdən, ifadə tərzindən xüsusi zövq alırlar. İntonasiya baxımından düzgün qurulmuş nitq diqqəti daim səfərbər edir, nəzərdə tutulmuş məqsədin, ideyanın dinləyiciyə asan çatmasına şərait yaradır. Əksinə, intonasiya çalarından məhrum olan nitq, monotonluq, süstlük, həddindən artıq sürətlə və ya yavaş danışıq, diksiyanın pozulması və s. dinləyicini yorur, bəzən hətta əsəbiləşdirir. Dinləyicilər bu cür natiqin mühazirəsindən, necə deyərlər, tez yaxa qurtarmağa çalışırlar.

İntonasiya həm danışıq, həm də oxu prosesi ilə bilavasitə əlaqədar olan ən xarakterik tələffüz hadisəsidir. Ünsiyyət prosesində danışan məqsədinə müvafiq şəkildə nitqinə müxtəlif səs tərtibatı verir. Başqa sözlə, danışıq prosesində təfəkkür fəaliyyətinin nəticəsi olan nitq rəngarəng intonasiya çalarına, boyalığına malik olur. İntonasiya cümlənin, ifadənin, ayrıca götürülmüş sözün təsir qüvvəsini nəinki artıra, onun əslində ifadə etdiyi mənanı təhrif edə, ya da tamamilə əks mənada başa düşülməsinə səbəb ola bilər.

Normal intonasiyadan uzaqlaşmanın bir halı danışıq və oxuda sürətin həddindən artıq olmasıdır. Lakin belə oxuda, danışıq və qiraətdə oxunanları və söylənilənləri tutmaq, anlamaq, mənimsəmək bir qədər çətin olur. İntonasiya ilə bağlı qüsurun başqa bir forması oxu və danışıq sürətinin normadan bir qədər yavaş olmasıdır. Belə nitqdə dinamika zəif, sözlər, nitq taktları, cümlələr arasındakı pauzaların müddət ölçüləri normadan artıq olur.

Nitqin intonasiyası kompleks dil hadisəsidir. İntonasiya tələffüzün dörd elementi – fasilə, vurğu, melodiya və tempi özündə birləşdirir. Nitqin gücü, zərbəsi, dinamikası 65 vurğusu, surəti onun tempi, istiqaməti onun melodiyası, dayanacağı isə fasilədir. Vurğu, fasilə, temp, melodiya nitqin xarici komponentləridir. Bu xarici komponentlər səslənməni yaradır. Bu ünsürlər – nitqin texniki cəhətləri nitq mədəniyyətinin əsas bölmələrindən biri olub, danışıq və oxuda ifadəliliyin yaranmasına xidmət edir.

**Vurğu.** Vurğu intonasiyanın əsas ünsürlərindəndir. Dilçilik ədəbiyyatında onun üç növündən – **söz vurğusu, məntiqi vurğu və həyəcanlı vurğudan** bəhs olunur.

**Nitq fasiləsi**. İntonasiyanın digər ünsürü fasilədir. Nitq müəyyən dayanacağa malikdir. Tənəffüs məqsədilə danışıq və oxu prosesində edilən bu dayanacaq **fasilə** (pauza) adlanır.

**Nitqin melodikliyi.** Nitq zamanı səs gah alçalır, gah da yüksəlir. Səsin müəyyən intervalda alçalıb qalxması musiqidə olduğu kimi, nitqdə də melodikliyi əmələ gətirir.

İfadəliliyin ən incə və mürəkkəb vasitələrindən biri də **tembrdir.**